UOT: 005.94

# SAHİBKARLIQ FƏALİYYƏTİNDƏ BİLİKLƏRİN İDARƏ EDİLMƏSİNİN NƏZƏRİ ƏSASLARI

**İ. İ. MƏMMƏDOVA**
**Azərbaycan Dövlət İqtisad Universiteti (UNEC)**

*Sahibkarlıq fəaliyyətində iqtisadi inkişafın ən mühüm amillərindən biri idarəetmə zəncirinin düzgün düzgün qurulmasıdır. Bu baxımdan biliklərin idarə edilməsi sahibkarın məqsədə çatmasında ən mühüm vasitədir. Məqalənin aktuallığın sahibkarlıq fəaliyyətində biliklərin düzgün inteqrasiyasına əsaslandırılmışdır. Tədqiqatın praktik əhəmiyyəti: effektiv idarəetmə aləti kimi bilik fonunda irəli sürülmüş təkliflər, biznesdə bilik ehtiyatlarının praktik istifadəsini ardıcıl surətdə nəzərdən keçirməyə və onların tətbiq edilməsinə dair iqtisad yönümlü yanaşmanın mövcud olduğu sahələri müəyyən etməyə kömək edəcək, təşkilatı vəsaitlərinin istifadə olunma effektivliyinin yüksəldilməsi üzrə tədbirlərin işləyib hazırlamasını asandlaşdırmaqa gətirib çıxaracaqdır. Tədqiqatın metodologiyasını nəzəri, təcrübi, ətraflı araşdırmalara söykənir. Tədqiqatın elmi yeniliyi kimi təşkilatlarda effektiv idarəetmə sistemi tərkibində bilik növlərinin semiotik təsviri irəli sürülmüşdür.*

***Açar sözlər:*** *fərdi biliklər, kollektiv biliklər, aşkar biliklər, gizli biliklər.*

Biliklərin idarə edilməsi prosesinin kompleks anlayışının təmin edilməsi məqsədləri üçün idarəetmə obyektini bu obyektin daxili strukturu və müxtəlif növlərinin mümkün təsnifatı nöqteyi-nəzərindən təhlil etmək lazımdır.

Təşkilatın və əməkdaşların malik olduğu bilikləri müxtəlif formalarda təsnifatlandırmaq olar. Belə təsnifatlardan birini M.Alavi və D.Leydnerin yanaşması əsasında F.Viynhoven vermişdir.[8] Təsnifatda bilik növlərinin fərqləndirildiyi bir çox əsaslar öz əksini tapır. Kodlaşdırıla bilmə qeyri-aşkar, aşkar və gizli biliklərin, biliklərin daşıyıcısı-subyekti isə fərdi və kollektiv biliklərin fərqləndirilməsinə əsaslanır. Kollektiv biliklərə həm təşkilati, həm də qeyri-təşkilati biliklər şamil edilir. Biliklərin tətbiq sferası spesifik və ümumi qəbul edilmiş biliklərə əsaslanır. Təfəkkür növlərinə münasibət bəyanedici və prosedur biliklərə əsaslanır. [1, səh. 479] Bəyanedici biliklərə real mövcud olan informasiya fenomenləri, məsələn konsepsiya, standart və layihə sənədləşdirmələri haqqında məlumatlar aid edilir. Prosedur biliklərinə bu və ya digər hərəkətlərin icrasının texnika və metodları şamil edilir. Hər hansı hərəkət, məsələn etirazları dəf etmək və ya kompüterdə çap etmək bacarığı avtomatlaşdırılmadığı təqdirdə prosedur bilikləri qeyri-aşkar formada təzahür edə bilər.

Biliklər kodlaşdırıla bilməsinə görə aşkar biliklər, qeyri-aşkar biliklər, gizli biliklər; daşıyıcı subyektə görə fərdi və kollektiv biliklər; tətbiq sahəsinə görə spesifik və ümumi tətbiq olunan biliklər; təfəkkür növlərinə görə bəyanedici və prosedur bilik növlərinə ayrılır.

Kodlaşdırıla bilmə əsası xüsusi diqqətə layiqdir. Sözügedən təsnifat çərçivəsində təkcə aşkar və qeyri-aşkar biliklər kimi geniş yayılmış terminlərlə təsvir edilən bilik növləri deyil, həm də gizli biliklər fərqləndirilir.

Aşkar biliklər, məzmunu və mövcudluğu insan tərəfindən tam şəkildə dərk olunaraq əhəmiyyətli informasiya itkisi olmadan digıər şəxsə verbal kommunikasiyalar vasitəsilə ötürülə bilən biliklərdir. Aşkar biliklərə misal kimi birmənalı və universal olan bu və ya digər dildə əlifbanı və düzgün yazıb-oxuma qaydalarını bilməyi göstərmək olar.

Qeyri-aşkar biliklər öz təbiətinə görə daha mürəkkəb obyektdir. Bu anlayışı ilk dəfə Polani: "biz ifadə etməyə qadir olduğumuzdan daha çox biliklərə sahib ola bilərik" şəklində irəli sürmüşdür.[9] Buna oxşar biliklərin insan tərəfindən dərk oluna bilməyə, məzmunu gizli ola bilər, lakin bununla belə insan öz fəaliyyəti prosesində ondan irrasional surətdə yararlana bilər. Qeyri-aşkar biliklərin irrasional xarakteri onun digər şəxslərə verbal metodlarla ötürülməsini çətinləşdirir. Məsələn, insana təlimat üzrə bədənin bir çox əzələlərinin əlaqələndirilmiş hərəkətini tələb edən hərəkət bacarıqlarını, məsələn velosiped sürməyi öyrətmək mümkün deyil.

Qeyri-aşkar biliklər verbal qaydada çətinliklə mübadilə edilsə də, hər bir insanın bütün biliklər toplusunun mühüm hissəsini təşkil edir. Qeyri-aşkar biliklərin öyrədilməsi başqa insanlarla birgə fəaliyyət prosesində baş verir. [10] Bu fəaliyyətə kommunikasiya ilə yanaşı ətraf mühit obyektlərilə qarşılıqlı əlaqə daxildir.

Gizli biliklər yuxarıda göstərilən təsnifatın genişləndirilmiş şərhi zamanı ayrıla bilən ayrıca bilik növüdür. İfadə edilə bilən və bilməyən biliklər arasında ənənəvi olaraq fərq qoyulduğu halda, bu fərqi adətən ifadə edilmiş və edilməmiş biliklər, məsələn, sənədli qaydada fiksasiya olunmamış biliklərin tutuşdurulması ilə səhv salırlar. Bununla belə fiziki formada ifadə edilməmiş olmaqla biliklər aşkar ola bilər. Qeyd edilən qarışıqlığı arada qaldırmaq üçün əlavə "gizli biliklər"

terminini irəli sürmək təklif olunmuşdur. Gizli biliklər ifadə edilmə iqtidarında olan, lakin təhrifsiz ifadə üçün xas olan çətinliklər üzündən aşkar biliklər kimi fiksasiya edilə bilməyən biliklər kimi müəyyən edilir. Üç bilik növünün tutuşdurulmuş xarakteristikası Cədvəl 1.-də təsvir edilmişdir.

**Cədvəl . Bilik növlərinin semiotik təsnifatı.**

| | | Bilik formalarının obyektivləşdirilməsi | |
|---|---|---|---|
| | | Obyektivləşdirilməmiş | Obyektivləşdirilmiş |
| Bilik növlərinin semiotik təsnifatı | Qeyri-aşkar biliklər | Xaricləşdirilməmiş bacarıqlar, şəxsi biliklər | İş üçün hazır vasitələr, ustalıq reseptləri, iş metodları |
| | Gizli biliklər | Ümumi qəbul edilmiş qeyri-formal norma və dəyərlər "burada belə məqbuldur" | Bu və ya digər şəxsi biliklərin daşıyıcıları olan insanlar barəsində məlumatlar. İmitasiya modellərindən istifadə etdikdən, sınaqlardan keçdikdən, biznes proseslərinin təhlilindən sonra əldə oluna bilən aşakr insaytlar (görüntü sahələri) |
| | Aşkar biliklər | İzahları, proqnoz və metodikaları ehtiva edən xaricləşdirilmiş, sənədləşdirilməmiş biliklər | Sənədləşdirilmiş bilik və məlumatlar, daha doğrusu fiziki olaraq ifadə edilən biliklər: layihənin sənədləşdirilməsi, istehsal planları, yol xəritələri və s., kapsullaşdırılmış biliklər. |

Cədvəldə göstərildiyi kimi, biliklər onların əks etdirilmə formalarının obyektivləşdirilməsi, daha doğrusu fiziki və virtual dünyanın real obyektlərində onların təcəssüm dərəcəsi əsasında iki kateqoriyaya bölünür. Obyektivləşdirmənin maksimal dərəcəsi fiziki və virtual obyektlərin struktur və funskionalında öz əksini tapan kapsullaşdırılmış aşkar biliklərdə, məsələn, şəhərdə hərəkətin naviqasiyasını asanlaşdıran proqram-da, yaxud avtomobildə quraşdırılmış cihazda öz əksini tapan biliklərdə müşahidə olunur.[2,səh.446] Kapsullaş-dırılmış aşkar biliklər hətta bu biliklərin natamam anlaşıldığı şəraitdə insan və ya təşkilat tərəfindən qarşıda duran vəzifələrin həll edilməsi üçün istifadə oluna bilər. Sadəcə idarə edilən obyektin funksionalı və onun ümumi iş sxemi haqqında məlumatlı olmaq tələb olunur. Təmsili olaraq, avtomobili idarə etmək üçün daxili yanma mühərrikinin iş prinsipini bilməyə ehtiyac olmadığını söyləyə bilərik.

Aşkar və qeyri-aşkar biliklər müxtəlif qaydalı fenomenlər deyildir. Müəyyən şəraitlərdə biliklərin bir növünün digərinə qarşılıqlı surətdə çevrilməsi baş verə bilər. İlk dəfə İ.Nonakanın təsvir etdiyi bu proses biliklər spiralının adını daşıyır.[11] Adı çəkilən proses çərçivəsində təşkilatın əməkdaşları arasında daima biliklər mübadiləsi gedir. Kontinuuma qapanmış bu prosesin dəqiq müəyyən edilmiş başlanğıcı və sonu yoxdur.

İ.Nonaka bilik mübadiləsinin daxilləşdirmə, kombinələşdirmə, sosiallaşdırma və xaricləşdirmədən ibarət olmaqla dörd baza mərhələsini ayırd etmişdir. Bunlardan ilk ikisi aşkar biliklər, son ikisi isə qeyri-aşkar biliklər qrupuna aiddir. Bu mərhələlələr kontinuumda qapandıqlarına görə hansı mərhələnin birinci, hansınınsa sonuncu olduğunu müəyyənləşdirməyin mənası yoxdur, buna görə də sadəcə onların hər birini nəzərdən keçirək.

Daxilləşdirmə mərhələsi aşkar biliklərə yiyələnmə və həmin biliklərin şüurun daxili planının qeyri-aşkar formasına köçürülməsi prosesini nəzərdə tutur. Buna nümunə olaraq yeni kommunikasiya avadanlığının istifadəçi təlimatlarının öyrənilməsini və sonra həmin avadalıqdan istifadə praktikasında bu bilikləri tətbiq etmək cəhdlərini göstərmək olar. Müəyyən vaxtdan sonra avadanlıqdan istifadə alqoritmi, başqa sözlə aşkar bilik, avtomatlaşdırılmış bacarığa çevrilən qeyri-aşkar bilik kimi təzahür edir.

İnsanlar arasında qeyri-aşkar biliklərin ötürülməsində özünü biruzə verən sosiallaşdırma mərhələsi şəxsiyyətlərarası kommunikasiyanın formallaşdırılmamış prosesi vasitəsilə həyata keçir.[3,səh.189] Ünsiyyət zamanı insanlarda metaforanın köməyilə öz məharətlərini bölüşmək, elmi məqalə oxuduqda məlumatların formal qavrayışı zamanı izahı mümkün olmayan mürəkkəb məqamları misallarla izah etmək imkanı meydana çıxır.

Xaricləşdirmə mərhələsinin əsasında qeyri-aşkar informasiyanın aşkara çevrilməsi durur. Bu mərhələnin əhəmiyyəti yetərincə qiymətləndirilməlidir, belə ki məhz burada şəxslərin qeyri-məhdud dairəsi arasında surəti çıxarılaraq yayılması üçün yararlı olan biliklər təşəkkül tapır. Sözügedən mərhələdə mütəxəssislər öz biliklərinin intuitiv formalarını verballaşdırmağa, bacarıqlarını təsvir etməyə, onları ictimaiyyətin nailiyyətinə çevirməyə çalışır. Adı çəkilən mərhələ verballaşdırılmış aşkar bilikləri özündə ehtiva edən maddi daşıyıcının, məsələn, biznes ustalığı barədə sirlər kitabı, elmi məqalə və s.-nin meydana çıxması ilə yekunlaşır.

Kombinələşdirmə mərhələsi mövcud aşkar biliklərin məna və məkan təşkili üsullarının dəyişdirilməsi vasitəsilə bu biliklərdən istifadə prosesinin optimallaşdırılmasını nəzərdə tutur. Hazırki mərhələdə mövcud informasiyanı ümumiləşdirmək, onu geniş şəxslər dairəsi üçün əlçatan etmək və onu mütəmadi şəkildə yeniləmək imkanı verən informasiya texnologiyaları mühüm əhəmiyyət kəsb edir.

Kollektiv biliklər bütün biliyin ayrı-ayrı elementlərinin qarşılıqlı əlaqələrinin kəmiyyəti vasitəsilə müəyyən edilən struktur mürəkkəbliyinin yüksək səviyyəsilə bütün təşkilati biliklər blokunun mühüm qismidir. Bu kimi qarşılıqlı asılılıqların mahiyyətini konkret nümunədə nümayiş etdirmək lazımdır.

Tədqiqatçılara görə, "Pratt və Uitni" şirkətinin həyata keçirdiyi reaktiv mühərrik qurğusunun tərtib edilməsi layihəsində 54 komponent arasında 569 qarşılıqlı asılılıq vardır. [4,səh.106] Həmin qarşılıqlı asılılıqlar material, enerji və informasiya ismarıclarının struktur əlaqələri və ya ötürülməsi formasında təzahür edir. Bu halda biliklərin struktur mürəkkəbliyinin səviyyəsi belə bir mühərrikin konstruksiyasının işlənib hazırlanması üçün tələb olunan ekspertizanın müxtəlif sahələri arasında qarşılıqlı asılılıqların kəmiyyətilə

müəyyən edilir. Məhsulun istehsalı üçün zəruri olan biliklər struktur mürəkkəbliyinin yüksək səviyyəsinə malik olduğu təqdirdə, konkret hər hansı sahədə ixtisaslaşmış mütəxəssis istehsal edilən məhsulun dizaynını təkcə özünün ekspertizası əsasında böyük ehtimalla yaxşılaşdıra bilməyəcək, belə ki, həmin mütəxəssisin dizayna etdiyi istənilən dəyişikliklər məhsulun, dizaynı başqa mütəxəssislər tərəfindən layihələndirilən və yeni ekspertizaları tələb edən digər elementlərin xarakteristikasına və beləcə bütövlükdə məhsula təsir göstərəcək. Beləliklə, mütəxəssislərin ayrı-ayrı fərdi bilikləri arasında hər bir mövcud qarşılıqlı asılılıq həmçinin, həmin mütəxəssislərin fərdi biliklərinin öz ixtisaslaşma sferalarında və konkret iş vəzifələrində tətbiqi səmərəliyinin yüksəldilməsi məqsədilə öz biliklərini hansı şəkildə mübadilə etməli olduqlarına dair kollektiv biliklərin olmasını tələb edir. Aydındır ki, belə fərdi biliklər və onlar arasında qarşılıqlı asılılıq nə qədər çox olarsa, kollektiv biliklər də bir o qədər böyük həcmi və mürəkkəbliyilə seçilər.[5,səh.349] Beləliklə, kollektiv bilikləri, istehsal edilən məhsulun keyfiyyətini yaxşılaşdırmaq üçün məhsul istehsalı üzrə işə cəlb edilmiş qrup üzvlərinni fərdi biliklərini necə təşkil və istifadə etmək lazım olduğu barədə qrup üzvlərinin ortaq razılığa gəldiyi bilikləridir.

Fərdi biliklərdən fərqli olaraq kollektiv biliklər mütləq şəkildə kontekstuallıq xassəsinə malik olur, başqa sözlə, kollektiv biliklər konkret situasiyada bilikləri necə tətbiq etmək və mürəkkəb vəzifələrin həlli çərçivəsində həmkarlarla necə qarşılıqlı fəaliyyət göstərmək tələb olunduğu haqıqnda bilikləri ehtiva edir. Hal-hazırda, həmçinin fərdi peşə biliklərinin də bir çox kütləsi yüksək konteksuallıq dərəcəsinə malikdir. Belə ki, innovasiya sferasında müasir istehsal vəzifələrinin əksəriyyətini kontekstuallıqdan məhrum edərək onların həlli üçün tipik alqoritmlər tətbiq etməyin qeyri-mümkünlüyünü nəzərə alsaq, istər fərdi, istərsə də kollektiv kontesktual biliklərin uğurla ötürülməsinin əhəmiyyəti yalnız artmaqdadır.

Yuxarıda deyildiyi kimi, təşkilatda biliklərin müxtəlif formaları mövcuddur və təbii olaraq təşkilati dinamikanın təsiri altında birindən digərinə keçirlər. Biliklərlə səmərəli işi yoluna qoymaq üçün ilk növbədə təşkilatda biliklərlə işi qarşılıqlı əlaqəli vəzifə blokları şəklində təsvir edən məntiqi modeli qurmaq lazımdır. Buna oxşar modelin qurulmasının işlək metodlarından biri, məhsulun həyat dövrünə analoji olaraq təşkilatda biliklərin həyat tsiklinin qurulmasıdır.[6,səh.448]

1993-cü ildən bəri çox sayda biliklərin idarə edilməsi sahəsində modellər irəli sürülmüşdür. Hayziqin apardığı tədqiqatlar nəticəsində ümumilikdə müəyyən edilmiş 160 modelin əksəriyyəti təşkilatda biliklərin həyat tsiklinin idarə olunması təşkil edir.

Təşkilatda biliklərin həyat dövrünün idarə edilməsinin ən birinci bütöv modellərindən olan, K.Viiqin 1993-cü ildə təklif etdiyi model biliklərlə dörd mərhələdən ibarət işi ehtiva edir. [7, səh.32] Bu model çərçivəsində tətbiq edilən yanaşma təşkilatda biliklərin fayda gətirməsi üçün mütəşəkkil və ardıcıl surətdə təzahürünə, modelin özününsə menecerlərin səmərəli şəkildə istifadəsinə imkan vermək məqsədilə həm kövrək, həm də maksimum konkret olmasına əsaslanır.

**ƏDƏBİYYAT**

**1.** F. Məmmədov "İdarəetmə mədəniyyəti", dərs vəsaiti, Bakı – 2013. **2.** "Sahibkarlığın əsasları", V. Niftullayev, Bakı – 2002. **3.** «Управление неявными знаниями в организации», Салихов Б.В., Салихова И.С., учебное пособие, Москва – 2015. **4.** «Управление знаниями – что это такое», Т. Кулопулос, К. Фраппаоло, London – 1999. **5.** "İqtisadiyyat fəlsəfəsi", elmi red. i.e.d., prof. Ə. İ. Bayramov, Bakı – 2009. **6.** "Menecmentin əsasları", T. Quliyev, Bakı – 2006. **7.** «Управление знаниями и интеллектуальным капиталом», С. В. Паникарова, М. В. Власов, Екатеринбург – 2015. **8.** nbpublish.com/view_post_48.html. **9.** hr-portal.ru/varticle/upravlenie-znaniyami-knowledge-management. **10.**ur-consul.ru/Bibli/Upravlyeniye-znaniyami-Kak-pryevratitjj-znaniya-v-kapital.63.html. **11.** cdomadi.ru/amu/event11.pl?id=107

**Теоретические основы управления знаниями в предпринимательской деятельности**

**И. И. Мамедова**

Одним из факторов экономического развития в предпринимательской деятельности является правильное строение цепи управления. В этом отношении, управление знаниями подразумевает средство достижения цели предпринимателем. Актуальность статьи основана на правильной интеграции знаний в области предпринимательской деятельности. Практическое значение исследования: предложения, выдвинутые на фоне знаний, как эффективный инструмент управления помогут последовательно рассмотреть практическое использование запасов знаний в бизнесе, и определить те отрасли, в которых имеются подходы с экономической ориентацией по их применению, также приведут к упрощению разработок мероприятий по повышению эффективности использования организационных средств. Методология исследования состоит из всесторонних теоретических, практических исследований. В качестве научной новизны исследования было предложено описание семиотических видов знаний в составе эффективной системы управления.

***Ключевые слова:*** индивидуальные знания, коллективные знания, явные знания, неявные знания.

**Theoretical bases of knowledge management in entrepreneurial activity**

**I. I. Mammedova**

One of the factors of economic development in entrepreneurial activity is the correct structure of the management chain. In this respect, knowledge management means remedies of achieving goals by an entrepreneur. The relevance of the article is based on the correct integration of knowledge in the field of entrepreneurial activity. Practical value of the research: the proposals put forward against the knowledge background as an effective management tool will help to consider the practical use of knowledge stocks in business consecutively, and to identify those industries in which there are approaches with an economic orientation for their application, will also foster simplification of the development of measures to improve efficiency of use of organizational means. The methodology of the research consists of comprehensive theoretical, practical research. As a scientific novelty of the research, a description of semiotic types of knowledge as part of an effective management system has been proposed.

***Key words:*** individual knowledge, collective knowledge, explicit knowledge, implicit knowledge.

***e-mail*** **-** mammadova405@mail.ru

